# Qədr gecəsini tapmaq üçün yola çıxmalıyıq

Qədr gecəsinə doğru yaxınlaşırıq. Biz çalışmalıyıq ki, bu gecəni taba bilək. Bunun üçün biz mütləq axtarışa çıxmalıyıq. "Axtaran tapar" deyiblər bizim atalarımız. Həmçinin bu böyük günün tapılması üçün bəzi məqamları bilməliyik. Ən əvvəl onu bilməliyik ki, qədr gecəsi ilin gecələrinin ən üstünü, fəzilətlisi, hörmətlisi, əzəmətlisidir. Allah təala belə buyurmuşdur: *"Mərhəmətli, rəhmli Allahın adı ilə!*
1 - *Həqiqətən, Biz onu (Quranı) Qədr gecəsi (lövhi-məhfuzda dünya səmasına) nazil etdik!*
2 - *(Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan bilirsən) ki, Qədr gecəsi nədir?!*
3 - *Qədr gecəsi (savab cəhətdən) min aydan daha xeyirlidir! (O, ramazan ayının on doqquzuna, iyirmi birinə, iyirmi üçünə, iyirmi beşinə, bir rəvayətə görə isə iyirmi yeddisinə təsadüf edir).*
4 - *O gecə mələklər və ruh (Cəbrail) Rəbbinin izni ilə (həmin gündən gələn ilin Qədr gecəsinədək dünyada baş verəcək) hər bir işdən dolayı (Allah dərgahından əmrlər alaraq) yerə enərlər.*
5 - *O gecə dan yeri sökülənə kimi (büsbütün) salamatlıqdır! (əmin-amanlıqdır) (Qədr gecəsi heç bir bəla nazil olmaz, o, bütünlüklə xeyir-bərəkətdən ibarətdir. O gecə mələklər yer üzündə gəzib Allahın müxlis bəndələrinə salam verərlər. Buna görə də Qədr gecəsi səhərə qədər oyaq qalıb ibadət etmək lazımdır!" (Qurani Kərim, əl-Qədr (Qədr gecəsi) surəsi)*.

Həqiqətən də qədr gecəsi axtarılmalıdır. Bu gecəni xüsusi olaraq Ramazan ayının son on günündəki tək günlərində axtarmaq müstəhəbdir. Yəni yaxşı əməldir. Allahın elçisi, sevimlimiz Məhəmməd peyğəmbər (səlləllahu aleyhi və səlləm) bu Qədr gecəsini Ramazanın son günlərində axtarardı. Ramazanın son on günü girdiyi vaxt gecələri ibadətlə keçirər, ailəsini oyadar, ibadət üçün yaxşıca hazırlaşardı. Belə ki, son gecələr xanımlarından uzaqlaşıb özünü ibadətə verərdi. Peyğəmbərimizin (səlləllahu aleyhi və səlləm) bu davranışı bizə onu bildirir ki, biz də bu Qədr gecəsini axtarmalıyıq. Əgər Allahın rəsulu (salavatullah) axtarıbsa deməli bu böyük və əzəmətli bir işdir. Biz də bundan dərs götürməliyik.

Qədr gecəsinin təyin edilməsi haqqında alimlərin müxtəlif fikirləri vardır. Bəziləri 21-ci, bəziləri 23-cü, bəziləri 25-ci, bəziləri 27-ci, digər bəziləri də 29-cu günlərin gecələri olduğunu demişlər. Bəziləri isə Peyğəmbərin (salavatullah) hədisinə uyğun olaraq son on gecələrin tək gecələrindən birinə dağılmışdır demişlər. Alimlərin çoxuna görə Qədr gecəsi Ramazanın 27-ci gecəsidir. Çünki bununla bağlı hədis vardır. Belə ki, Əhməd ibn Hənbəl (Allah ona rəhmət etsin) səhih bir sənədlə İbn Ömərdən (Allah ondan və atasından razı olsun) rəvayət etdiyi hədisdə Allah rəsulu (səlləllahu aleyhi və səlləm) belə demişdir: *"Hər kim qədr gecəsini axtarsa onu iyirmi yeddinci gecəsində axtarsın".*

Müslim, Əhməd, Əbu Davud və Tirmizinin Übeyy bin Kəbdən (Allah ondan razı olsun) rəvayət edərək, Tirmizinin səhih dediyi hədisdə Übey bin Kəb belə demişdir: "Özündən başqa ilah olmayan Allaha and olsun ki, Qədr gecəsi Ramazanın içərisindədir. Yenə də Allaha and olsun ki, onun hansı gecə olduğunu bilirəm. Qədr gecəsi, Allah rəsulunun (ona və ailəsinə salam olsun) bizə əhya etməklə əmr etdiyi, Ramazanın iyirmi yeddinci gecəsidir". (Belə ki, hədisdən də göründüyü kimi səhabə Qədr gecəsinin məhz bu gecə olmasına and içir. Qədr gecəsinin bir çox əlamətləri vardır. Ən böyük əlaməti odur ki, günəş həmin gecənin səhəri ziyası olmadan doğar.

Ümumiyyətlə bu gecənin özünə xas bəzi xüsusiyyətləri vardır ki, biz onları bu qısa məqalədə qeyd etməyəcəyik. Əsasən ona toxunmağı vacib bilirik ki, bu gecədə əsasən hansı ibadətləri yerinə yetirməliyik. Bu barədə yenə də Allah rəsulundan (s.ə.s) gələn hədisə baxacağıq. Buxari və Müslimin Əbu Hürüyrədən (r.a) rəvayət etdiyi hədisdə Allahın elçisi (s.ə.s) belə buyurmuşdur: "Hər kim qədr gecəsini inanaraq və savabını Allahdan gözləyərək ibadətlə keçirərsə onun keçmiş günahları bağışlanar".

Əhməd, İbn Macə və Tirmizinin Aişədən (Allah ondan razı olsun) rəvayət edərək, Tirmizinin də səhih saydığı hədisə görə Aişə (r.a) belə buyurmuşdur: "Ya Rəsulullah! Qədr gecəsinin hansı gecə olduğunu bilsəm nə deyim?" Aişə rəvayət edir ki, Allah rəsulu (s.ə.s) belə deməyimi əmr etdi: "Allahım! Sən bağışlayansan, bağışlamağı sevənsən, məni bağışla".

Bu gecə çox dua eləmək, Allahdan bağışlanma diləmək, tövbə və istiğfar eləmək lazımdır. Bəzi insanlar elə başa düşür ki, bu gecəni səhərə qədər oyaq qalmaq lazımdır. Təbiidir ki, əgər buna imkanı və gücü çatarsa oyaq qalsın. Amma bu o demək deyildir ki, səhərə qədər çilə çıxarıb ibadətdən kənar bir işlə məşğul olasan. Bu qətiyyən yol verilməzdir. Əsasən bilməlisən ki, bu gecənin bir hissəsində müəyyən qədər ibadət, etsən, Quran oxusan, zikr etsən, namaz qılsan sənə kifayət edər. Təəssüf edirik ki, müsəlmanların bir çoxu bunu yalnış anlamışlar. Hətta biz çox şahidi olmuşuq ki, gənclər Qədr gecəsində səhərə qədər oyaq qalıb digər işlərlə məşğul olurlar. Halbuki oyaq qalmaqda məqsəd təkcə Novruz bayramındakı kimi çilə çıxarmaq deyil, ancaq və ancaq Allaha yönəlib dua etmək, bağışlanma üçün yalvarmaq və Allahı çox zikr etməkdir. Allah təala bizə Qədr gecəsinin qədr-qiymətini vermənin yollarını göstərsin. Qədr gecəsində ibadət edib günahları bağışlanan kimsələrdən olaq. Amin!.

Əkrəm Həsənov

## Qədr gecəsi və bəzi əlamətləri

Aləmlərin Rəbbi olan Allaha həmd olsun ki, bəzi məkanları, yerləri, vaxtları, zamanları bir-birindən üstün etmişdir. Bu vaxtlardan da biri gecə vaxtlarından olan Qədr gecəsidir. Bu elə bir mübarək gecədir ki, uca Allah Qurani Kərimi o gecədə nazil etmişdir.

Artıq bunu bilməlisiniz ki, Allah təala Məhəmməd ümmətini də digər ümmətlərdən üstün edib xüsusiləşdirmişdir. Allah təala bu ummәti ona görə digər ümmətlərdən üstün edib xüsusiləşdirmişdir ki, bu ümmətə xüsusi olaraq elçi göndərmiş və bu ümmətə əvvəlki ümmətlərə vermədiyi çox əzəmətli bir kitab nazil etmişdir. Aləmlərin Rəbbinin kəlamı bu ümmətə ən xeyirli gecədə nazil olunmuşdur. Allah təala bu gecəni başqa digər gecələrdən xüsusiləşdirib seçmişdir. Deməli Allah təala ən xeyirli gecədə, ən xeyirli kəlamı nazil etmiş, ən xeyirli elçisini bizə göndərmiş və bizi ən xeyirli ümmət etmişdir. Belə olduğu halda nə üçün bizim içərmizdə olan bu insanlar bu ümmətdən olmaq üçün səy etmirlər? Nə üçün ən xeyirli ümmət olmaq üçün dəstə-dəstə islamı qəbul edib, Allahın və göndərdiyi ən xeyirli elçisinin əmrlərini yerinə yetirmirlər? Onlar buna layiq deyillərmi, yoxsa özlərini bu şərəfə nail etmək istəmirlər? Artıq bu sual ətrafında özləri düşünsünlər.

Allah təala Qədr gecəsini o qədər xeyirli, əzəmətli bir gecə etmişdir ki, bu gecədə olunan ibadətlər min ayda olunan ibadətlərdən xeyirlidir. Bunun da səbəbi məhz bu gecənin min aydan xeyirli olması üçündür. Yəni bu gecənin min aya bərabər olmasıdır ki, bu da 83 il 4 ay edir. Yəni bu gecə 83 il 4 aya bərabər olan bir gecədir. Bu xəbəri bizə haqq olan uca Rəbbimiz çatdırmışdır, bizə bildirmişdir ki, biz bu gecədən qəflətə düşməyək. Ya Rəbbimiz! Bu gecənin haqqını verməkdə bizə kömək ol! Amin!

Bu gecənin Qədr gecəsi olmasını və min aydan xeyirli olmasını uca Allah açıq aşkar bizə xəbər vermişdir: “Həqiqətən, Biz onu (Quranı) Qədr gecəsi (lövhi-məhfuzda dünya səmasına) nazil etdik! (Ya Peyğəmbər!) Sən nə bilirsən (haradan

bilirsən) ki, Qədr gecəsi nədir?! Qədr gecəsi (savab cəhətdən) min aydan daha xeyirlidir! (O, ramazan ayının on doqquzuna, iyirmi birinə, iyirmi üçünə, iyirmi beşinə, bir rəvayətə görə isə iyirmi yeddisinə təsadüf edir). O gecə mələklər və ruh (Cəbrail) Rəbbinin izni ilə (həmin gündən gələn ilin Qədr gecəsinədək dünyada baş verəcək) hər bir işdən dolayı (Allah dərgahından əmrlər alaraq) yerə enərlər. O gecə dan yeri sökülənə kimi (büsbütün) salamatlıqdır! (əmin-amanlıqdır) (Qədr gecəsi heç bir bəla nazil olmaz, o, bütünlüklə xeyir-bərəkətdən ibarətdir. O gecə mələklər yer üzündə gəzib Allahın müxlis bəndələrinə salam verərlər. Buna görə də Qədr gecəsi səhərə qədər oyaq qalıb ibadət etmək lazımdır!)" (Əl-Qədr surəsi 1-5-ci ayələr).

Həmçnin Allah təala Qurani Kərmi bu gecədə nazil olmasını bizə Duxan surəsində də xəbər vermişdir: "Ha, Mim! (Haqqı batildən, halalı haramdan ayıran) açıq-aydın Kitaba and olsun ki, Biz onu mübarək bir gecədə (qədr gecəsində) nazil etdik. Biz (o Kitab vəsitəsilə kafirləri Öz əzabımızla) qorxuduruq! Hər bir hikmətli (dəyişilməsi mümkün olmayan) iş o gecə hökm (ayırd) olunur, Dərgahımızdan bir buyuruq olaraq! Həqiqətən, (peyğəmbərləri) Biz göndəririk, Sənin Rəbbindən (bəndələrə) bir mərhəmət olaraq (ya Peyğəmbər!). Şübhəsiz ki, O (hər şeyi) eşidəndir, (hər şeyi) biləndir! O, göylərin, yerin və onların arasında olanların (bütün məxluqatın) Rəbbidir. (Ey Məkkə əhli!) Əgər (Allahın haqq olduğuna) tam yəqinliklə inanırsınızsa (bilin ki, Muhəmməd əleyhissəlam da Onun Peyğəmbəridir)! Ondan başqa heç bir tanrı yoxdur. O həm dirildir, həm də öldürür. O həm sizin Rəbbiniz, həm də ulu babalarınızın Rəbbidir" (Əd-Duxan (duman) surəsi, 1-8).

Nə üçün bu gecəyə Qədr gecəsi deyilir? Şeyx ibn Useymin (Allah ona rəhmət etsin) belə demişdir: Birincisi, bu gecənin digər gecələrdən şərəfli olması üçündür, çünki ərəblər bir insanı başqa insandan üstün hesab edəndə "əl-qədr" (şərəfli) filankəs, filankəsdan daha qədrli, yəni şərəflidir. İkincisi, həqiqətən də bu gecədə gələn ilə qədər olan qədərlər təyin olunur. Bir il ərzində baş verəcək bütün işlər təqdir olunur. Bu Allah təalanın əvvəlcədən təyin etdiyi bir hökmdür. Üçüncüsü, Allah Rəsulunun bir sözünə əsasən bu gecədə olan ibadətlər, digər gecələrdə və günlərdə

olan ibadətlərdən daha xeyirli, daha üstün, daha şərəfli və daha qədrli qiymətlidir. Allahın Rəsulu (səllallahu aleyhi və səlləm) buyurmuşdur: Kim, inanaraq, savabını Allahdan istəyərək qədr gecəsini ibadət üçün ayaqda durarsa, onun keçmiş və gələcək bütün ganahları bağışlanar” (Buxari və Müslim).

Qədr gecəsinin bəzi əlamətləri vardır. Bunlardan biri gecənin nurlu olması və səhər günün şüası olmadan çıxması və nurunun çox olması, qəlbin mütmain (rahat) olması, möminin sinəsinin geniş olması, yəni sevincli və fərəh içində olması, başqa gecələrdən fərqli olaraq bu gecədə olan ibadətlərin daha ləzzət verməsi və daha imanın artdığının müşahidə olunması və s.

Yazıb hazırladı: Əkrəm Həsənov

Məqaləni Yahya Əz-Zəhraninin “Qədr gecəsi və əlamətləri” haqqında yazdığı məqalədən tərcümə edərək, bəzi əlavələr də edərək hazırladım.